بسم الله الرحمن الرحيم

## XUTBEYİ-HACCƏ

Həmd yalnız Allaha *c.c* məxsusdur. Ona həmd edir, Ondan yardım və bağışlanma istəyirik. Nəfslərimizin şərindən və əməllərimizin pisliklərindən Ona sığınırıq. Allah *c.c* kimə hidayət verərsə onu azdıra biləcək, kimi də azdırarsa ona hidayət verə biləcək birisi yoxdur.

Şəhadət edirəm ki Allahdan başqa ibadətə layiq ilah yoxdur. O təkdir və şəriki yoxdur. Yenə şəhadət edirəm ki Muhəmməd Onun qulu və Rəsuludur.

Allah *c.c* belə buyurur:

**“Ey iman gətirənlər! Allahdan layiqincə qorxun və ancaq müsəlman olaraq ölün!”** [1]

**“Ey insanlar! Sizi tək bir nəfsdən xəlq edən, ondan zövcəsini yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun. Adıyla bir-birinizdən cürbəcür şeylər istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir.”** [2]

**“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin ki, Allah əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Rəsuluna itaət edərsə böyük bir qurtuluşa çatmış olar.”** [3]

Şübhəsiz ki sözlərin ən doğrusu Allahın *c.c* kəlamı, yolların ən xeyirlisi isə Muhəmmədin *(səlləllahu əleyhi və səlləm)* yoludur. İşlərin ən pisi sonradan uydurulandır. Sonradan uydurulub, dinə soxulan hər bir əməl bidət, hər bidət zəlalət və hər zəlalət də oddadır.

## MÜƏLLİFİN ÖN SÖZÜ

Həmd yalnız Allaha məxsusdur. Ona həmd edir, Ondan yardım və bağışlanma istəyirik. Nəfslərimizin şərindən, və əməllərimizin pisliklərindən Ona sığınırıq. Allah *c.c* kimə hidayət verərsə onu azdıra biləcək, kimi də azdırarsa ona hidayət verə biləcək birisi yoxdur.

Şəhadət edirəm ki Allahdan başqa ibadətə layiq ilah yoxdur. O təkdir və şəriki yoxdur. Yenə şəhadət edirəm ki Muhəmməd Onun qulu və Rəsuludur.

---

[1] Ali-İmran: 3/102.
[2] Ən-Nisa: 4/1.
[3] Əl-Əhzab: 33/70-71.

Onun əhlinə, səhabələrinə və qiyamətə qədər Onun sünnətinə tabe olanlara salam olsun.

İbadətlərdən sonra Allah *c.c* bizə onu zikr etməmizi əmr etmiş və zikr edənləri öymüşdür. Bunun əvəzində böyük savab vəd etmişdir.

Allah *c.c* belə buyurur:

**"Namazı bitirdikdən sonra ayaq üstə olanda da, uzananda da, Allahı zikr edin..."** [4]

**"Həcc ibadətinizi qurtardıqda, ata-babalarınızı yada saldığınız kimi, hətta ondan daha da artıq Allahı yad edin..."** [5]

**"(Həcc mövsümündə) Rəbbinizdən ruzi istəmənizdə hər hansı bir günah yoxdur. Ərafatdan endiyiniz zaman Məşərulharamda Allahı zikr edin..."** [6]

**"...Məlum günlərdə Allahın onlara ruzi olaraq verdiyi heyvanları qurban kəsərkən Onun adını zikr etsinlər."** [7]

**"... Bəlli olan günlərdə Allahı zikr edin... "** [8]

**"...Məni anmaq üçün namaz qıl."** [9]

**"Ey iman gətirənlər! Allahı çox zikr edin! Onu səhər axşam təsbih edin!"** [10]

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***"Təşriq günləri (bayramlarda təkbirlərin gətirildiyi günlər) yemək, içmək, Allahı zikr etməkdir."*** [11]

***"Duaların ən xeyirlisi ərafa gününün duasıdır. Mənim söylədiyim və məndən öncəki peyğəmbərlərin söylədikləri ən xeyirli şey budur: Allahdan başqa ibadətə layiq ilah yoxdur, təkdir, şəriki yoxdur. Mülk yalnız Onundur. Həmd yalnız Onadır və O hər şeyə qadirdir."*** [12]

---

[4] Ən-Nisa: 4/103.
[5] Əl-Bəqərə: 2/200.
[6] Əl-Bəqərə: 2/198.
[7] Əl-Həcc: 22/28.
[8] Əl-Bəqərə: 2/203.
[9] Ta-Ha: 20/14.
[10] Əl-Əhzab: 33/41-42.
[11] Muslim: Oruc: 23.
[12] Tirmizi: Dəvət: 133, Muvatta: Quran: 32.

“Ləə iləhə illəllah” zikrlərin ən fəzilətlisidir. Bu kəlmənin zikrlər arasında yeri çox böyük olduğundan mənası və şərtləri bilinib, tələbləri yerinə yetirilməlidir. Bu kəlməni sadəcə dillə söyləmək yetərli deyil.

Allahdan *c.c* bizi və sizi “Ləə iləhə illəllahın” mənasını bilənlərdən, gizli və açıq bütün hökmlərini yerinə yetirənlərdən və Ona bağlananlardan etməsini diləyirik.

Salih bin Fauzan bin Abdullah əl-Fauzan.

## LƏƏ İLƏHƏ İLLƏLLAHIN DİNDƏKİ YERİ, ƏHƏMİYYƏTİ VƏ ÖNƏMİ

Müsəlmanlar hər gün azanlarında, iqamələrində, xütbələrində və danışıqlarında “Ləə iləhə İlləllah” kəlməsini dəfələrlə söyləyirlər. Şəhadət kəlməsi: yer və göylərin, bütün məxluqatın onun üçün yaradıldığı, Allahın *c.c* nəbi və rəsullarını onunla göndərdiyi, kitablarını onun üçün endirdiyi, şəriətini onun üçün qoyduğu bir kəlmədir.

Bu kəlməyə görə məxluqat, mömin və kafir, yaxşı və pis olaraq iki sinfə ayrılırlar. Bu kəlmə: yaradılışın məqsədi, əmr və qadağaların, savab və cəzanın qaynağı, məxluqatın onun üçün var edildiyi, sorğu-sualın və mühakimənin onun haqqında olduğu kəlmədir. Savab və cəza onun üzərində qurulur. Qiblə onun üzərində təməlləndirilmişdir. Din, o kəlmə üzərinə təsis edilib qurulmuş, cihad qılıncları onun üçün sıyrılmışdır. Bu Allahın *c.c* bütün qulları üzərindəki haqqı olan kəlmədir. O İslama giriş kəlməsi, salamatlıq yurdu olan Cənnətin açarıdır.

Bütün əməllərin “Ləə iləhə illəllah” kəlməsi üzərində bina edilməsi səbəbiylə, bu kəlmənin İslamdakı yeri və önəminin bilinməsi bütün qullar üzərinə fərzdir.

Öncəki ümmətlər və gələcək millətlər, o kəlmədən hesaba çəkiləcəklər. Allahın *c.c* hüzurunda iki məsələ haqda soruşulmadıqca qulun ayağı yerindən oynamayacaqdır:

**1**. Nəyə ibadət edirdiniz?

**2**. Nəbi və Rəsulların dəvətinə nə cavab verdiniz?

Birinci sualın cavabı: “Bilərək və şüurlu olaraq özündən başqa ibadətə layiq ilah olmayan Allaha ibadət edirdik.”

İkincinin cavabı: “Muhəmmədin *(səlləllahu əleyhi və səlləm)* Allahın elçisi olduğunu qəbul edib, ona təslim olduq və itaət etdik” olmalıdır. [13]

İbrahimin *as* tutmuş olduğu sağlam qulp “Ləə iləhə illəllah” kəlməsi, İslam və küfr sərhədidir.

---

[13] İbni-Qayyim: Zadul-Mead: 2/1.

Allah *c.c* belə buyurur:

**"İbrahim bu sözü özündən sonra gələcək olanlara davamlı qalacaq bir miras olaraq buraxdı ki bəlkə insanlar düz yola qayıtsınlar."** [14]

Allah *c.c*, elm əhli və mələklər bu kəlməyə şahidlik etmişlər.

Allah *c.c* belə buyurur: **"Allah, mələklər və ədalətli elm sahibləri, Allahdan başqa ibadətə layiq ilah olmadığına şahidlik etmişlər. Ondan başqa ibadətə layiq ilah yoxdur. O Əzizdir, Hakimdir."** [15]

Bu kəlmə, bütün məxluqatın onun üçün yaradıldığı təqvadır, ixlasdır, haqqa şəhadət və şirkdən uzaqlaşmaqdır.

Allah *c.c* belə buyurur:

**"Mən cinləri və insanları, yalnız mənə ibadət etsinlər deyə yaratdım."** [16]

Allah *c.c* Rəsullarını bu kəlmə ilə göndərmiş, kitablarını onun üçün endirmişdir. Allah *c.c* belə buyurur:

**"Səndən əvvəl elə bir rəsul göndərmədik ki, ona: "Məndən başqa ibadətə layiq ilah yoxdur. Yalnız mənə ibadət edin" deyə vəhy etməyək."** [17]

**"Allah mələkləri qullarından dilədiyi kimsəyə özündən bir vəhylə göndərib belə buyurar: "Məndən başqa ibadətə layiq ilah yoxdur. Məndən qorxun!"** [18]

**İbni Uyeynə** [19] *rh* demişdir:

"Allah *c.c* "Ləə iləhə İlləllah"ı haqqıyla bilən qullarını böyük nemətlərlə nemətləndirmişdir. Dünya əhli üçün sərin su nədirsə, Cənnət əhli üçün də "Ləə iləhə İlləllah" odur." [20]

Kim "Ləə iləhə İlləllahı" deyərsə, malı və qanı qorunmuşdur. Kim də inkar edib yalanlayarsa, malı və qanı halal olar.

---

[14] Əz-Zuxruf: 43/28.

[15] Ali-İmran: 3/18.

[16] Əz-Zariyyat: 51/56.

[17] Əl-Ənbiya: 21/25.

[18] Ən-Nəhl: 16/2.

[19] Sufyan İbni-Uyeynə. Fiqh və hədis alimidir. Hicri 107-ci ildə Kufədə doğulmuş, 198-ci ildə Məkkədə vəfat etmişdir. Tabii-Tabiinlərdəndir. Dörd yaşında quranı əzbərləmiş, yeddi yaşında hədis yazmağa başlamışdır. 7000 dən artıq hədis rəvayət etmişdir. İmam Şafii ondan fiqh dərsi almışdır.

[20] Hafiz İbni-Rəcəb: Kəlmətul-İxlas: 52-53.

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***"Hər kim "Allahdan başqa ibadətə layiq ilah yoxdur" deyər və Allahdan başqa ibadət edilən şeyləri rədd edərsə malı və canı haram olar. Hesabı da Allaha aiddir."*** [21]

İnsanlar İslama ilk öncə dəvət edilərək, onlardan bu kəlməni söyləmələri istənilir. Nəbi *(səlləllahu əleyhi və səlləm)* Muaz bin Cəbəli *ra* Yəmənə göndərərkən ona belə dedi:

***"Sən kitab əhli olan bir qövmə gedirsən, onları ilk olaraq Allahdan başqa heç bir ilah olmadığına dəvət et..."*** [22]

## LƏƏ İLƏHƏ İLLƏLLAHIN FƏZİLƏTİ

"Ləə iləhə İlləllah"ın Allah qatındakı yeri və fəziləti çox böyükdür. Kim sadiq olaraq bu kəlməni söyləyərsə (və tələblərini yerinə yetirərsə) Cənnətə girər. Kim bu kəlməni yalandan söyləyərsə həbs edilər və malı əlindən alınar. Hesabı isə Allaha *c.c* aiddir. Az sayda hərflə, qısa ləfzlərlə söylənən və dilə yüngül gələn bu kəlmə tərəzidə ağır gələcəkdir.

Əbu Səid əl-Hudridən *ra* Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurdu:

***"Musa as dedi ki: "Ya Rəbbim! Mənə Səni xatırlayıb dua edə biləcəyim bir şey öyrət."***

***Allah c.c belə buyurdu:***

***"Ey Musa! "Ləə iləhə illallah" de.***

***Musa as dedi ki:***

***"Ey Rəbbim! Bütün qulların bunu deyir."***

***Allah c.c belə buyurdu:***

***"Musa! Yeddi qat göylər, Məndən başqa içindəki məxluqatla və yeddi qat yer içində olanlarla tərəzinin bir gözünə qoyulsa, "Ləə iləhə İlləllah" ağır gələr."*** [23]

Bu hədisdən də anlaşıldığı kimi "Ləə iləhə İlləllah" zikrlərin ən fəzilətlisidir.

Abdullah İbni Ömərdən *ra* : Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurdu:

---

21 Muslim: İman: 8.

22 Buxari: Məğazi: 62, Muslim: İman: 7.

23 Hakim: 1/528, İbni-Hibban: 2324, Məvariduz-Zaman: 19.

***"Duaların ən xeyirlisi ərafa gününün duasıdır. Mənim söylədiyim və məndən öncəki peyğəmbərlərin söylədikləri ən xeyirli şey budur: - Allahdan başqa ibadətə layiq ilah yoxdur, təkdir, şəriki yoxdur. Mülk yalnız Onundur. Həmd yalnız Onadır və O hər şeyə qadirdir."*** [24]

Abdullah bin Amr bin əl-Asdan *ra*: Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurdu:

***"Qiyamət günündə Allah c.c ümmətimdən bir adamı ayıracaq. Onun əleyhinə doxsandoqquz sicil (kitab) açacaq. Hər bir kitabın boyu gözün görə biləcəyi ən uzaq məsafə qədər olacaq. Sonra:***

***"Bunlardan bir şeyi rədd edirsənmi?" deyəcək.***

***"Xeyr ya Rəbbim" deyə cavab verəcəkdir. Sonra:***

***Allah c.c :***

***"Yanımızda sənin bir həsənən (məqbul olan əməlin) vardır və bu gün sənə qarşı haqsızlıq edilməyəcəkdir." Sonra içində "Allahdan başqa ibadətə layiq ilah olmadığına və Muhəmmədin Onun qulu və Rəsulu olduğuna şəhadət edirəm" yazılmış bir kağız parçası çıxarılacaq.***

***"Ya Rəbbim bu kiçik kağız parçası, o böyük kitablardan ağır gələrmi?" deyəcək.***

***Cənabı Haqq:***

***"Sənə zülm edilməyəcək" buyuracaqdır. Kitablar tərəzinin bir gözünə, kağız parçası isə o biri gözünə qoyulacaq, kitablar havaya qalxacaq və kağız parçası (yəni "Ləə iləhə İlləllah"ın qoyulduğu göz) ağır gələcəkdir."*** [25]

Bu kəlmənin fəzilət və böyüklüyünü **Hafiz İbni Rəcəb** [26] "Kəlmətul-İxlas" adını verdiyi risaləsində belə dəlilləndirməkdədir:

""Ləə iləhə İlləllah" Cənnətin qarşılığıdır. Kim bu kəlməni söyləyərək ölərsə Cənnətə girər. Bu kəlmə atəşdən qurtuluşdur və ən gözəl həsənədir. Günah səhifələrini silərək qəlbdəki imanı yeniləyər, varlığını ortaya çıxarar. Hicabları ortadan qaldırar. Bu, söyləyəni Allahın *c.c* doğruladığı və nəbilərin söylədiyi fəzilətli bir söz, ən gözəl və ən fəzilətli zikrdir. Əməllərin ən fəzilətlisi və savabı ən çox olanıdır. Bu kəlmə kölə azad etməyə bərabər savab qazandırar. Şeytandan Allaha *c.c* sığınmadır. Həşrin qorxusundan

---

24 Tirmizi: Dəvət: 133, Muvatta: Quran: 32.

25 Tirmizi: İman: 17 (2641), İbn Macə: Zühd: 35 (4300) , Əhməd: 4/ 213,22.

26 Əl-Hafiz İbni-Rəcəb. Hədis və Fiqh alimidir. Hicri 736-cı ildə doğulub,hicri 795-ci ildə vəfat edib. Günümüzdə sözügedən "Kəlmətul-İxlas" əsərinin əlyazması mövcuddur və Allahın iznilə bu kitab da dilimizə tərcümə olunacaq.

və qəbrin vəhşətindən əmin olmaqdır. Qəbirlərindən qalxdıqlarında ("Ləə iləhə İllələllah") möminlərin bir şüarıdır.

Onu söyləyənə Cənnətin səkkiz qapısı açılar və hansından diləsə ondan girər. Onun haqqını vermədikləri üçün atəşə girən günahkar möminlər, günahları nisbətində yandıqdan sonra oddan çıxarlar. "

İbni Rəcəb *rh* bunların hər birini dəlilləndirmişdir. [27]

## LƏƏ İLƏHƏ İLLƏLLAHIN DÜZGÜN ANLAŞILMASI

Alimlər "Ləə iləhə İllələllah"ın düzgün anlaşılmasına böyük önəm vermişlər. Bu kəlmənin əvvəlindəki "Lə" hərfi yoxluq ədatı olub, bir şeyi rədd etmək üçün işlədilir. "İlah" isminin hərəkəsi fəthə üzərində sabitdir. Xəbəri isə gizlidir. Onun təqdiri isə "haqq" yəni ("Ləə iləhə İllələllah") haqq ilah yoxdur.

"İllələllah" ibadət edilən, zərəri dəf edən, fayda verən və qəlbləri ibadətə yönəldən tək ilah vardır deməkdir. Kim bu kəlmənin xəbərini "mevcudun" və ya "məbudun" kəlmələri üzərində təqdir edərsə böyük bir xəta etmişdir. Çünki türbələrdən və bütlərdən ibadət olunan ilahlar vardır, ancaq əsl ibadət edilməyə layiq olan yalnız uca Allahdır.

Onun heç bir şəriki yoxdur. Əgər ibadət edilən bir şey varsa o da, ona edilən ibadət də batildir. Bunun belə olduğuna inanmaq "Ləə iləhə İllələllah"ın gərəyidir.

## LƏƏ İLƏHƏ İLLƏLLAHIN RÜKNLƏRİ

"Ləə iləhə İllələllah"ın iki rüknü var:

**1-Rədd:** Allahdan *c.c* başqalarının ilahlıq iddiasının ortadan qaldırılmasıdır.

**2-İsbat:** Allahın *c.c* haqq ilah olduğunun isbatı. Çünki müşriklərin ondan başqa ibadət etdikləri ilahların hamısı batildir.

Allah *c.c* belə buyurur:

**"Bu belədir. Allah haqq olandır, ondan başqa ilah edib, ibadət etdikləri isə batildir..."** [28]

**İmam İbni Qayyim** [29] *rh :* "Ləə iləhə İllələllah"ın mənası, Allahın *c.c* əsl ilah olduğunu isbatlamaqdır. "Ləə iləhə İllələllah" sözü, "Allah ilahdır" sözü, Allahdan başqa

---

27 Hafiz İbni Rəcəb: Kəlmətul-İxlas: 54-56.

28 Əl-Həcc: 22/62

29 İbnul Qayyim əl-Cevziyyə. Şeyxul-İslam İbni Teymiyyədən dərs almışdır Onunla birlikdə, verdiyi fətvalara görə dəfələrlə həbsə düşmüşdür. Hicri 751-ci ildə vəfat etmişdir.

saxta ilahları rədd etməz. Halbuki "Ləə iləhə İlləllah"ın tələbi ilahlığı ancaq Allaha xas qılmaq, Allahdan başqa saxta ilahları isə rədd etməkdir."

**Şeyx Süleyman bin Abdullah** [30] *rh:*

**"-**İlah- kəlməsini qadir, yaradıcı və s. şəklində açıqlayanlara iki yöndən cavab verir:

Birincisi: Bu sələfin təfsiri olmayıb mutəahhirinin [31] təfsiridir. Sələf alimləri və lüğət alimləri bunu bizim kimi açıqlamışlar. Bunlardan başqasının açıqlamasına etibar edilməz.

İkincisi: Haqq olan ilah üçün gərəkli olan təfsir, bizim açıqladığımızdır.

Onlar "İlah" kəlməsini bu şəkildə təfsir edərək "Allahdan başqa yaradıcı yoxdur, Ondan başqa heç kimin hər şeyə gücü çatmaz" deyən hər kəsi müsəlman saymaqla çox böyük bir xətaya düşmüşlər." [32]

## LƏƏ İLƏHƏ İLLƏLLAHIN ŞƏRTLƏRİ

Aşağıdakı yeddi şərt yerinə yetirilmədiyi təqdirdə "Ləə iləhə İlləllah" kəlməsi insana fayda verməz.

**1. Elm:** "Ləə iləhə İlləllah"ın mənasını bilməkdir. Bu kəlmənin əvvəli inkar, davamı isə təsdiqdir. "Ləə iləhə" inkar, "illa" istisna ədatı, "illəllah" isə istisna ədatıyla bərabər isbatdır. Bu söz, Allahdan *c.c* başqa bütün ilahları ortadan qaldırmaqdadır. Mənasını bilmədən bu kəlməni söyləmək insana fayda verməz. Çünki insan bu kəlmənin nəyə dəlalət etdiyini bilib buna dayana bilməz. Bu adamın vəziyyəti xarici bir dildə danışıb heç bir şey anlamayan adamın vəziyyəti kimidir.

Allah *c.c* belə buyurur:

**"Bil ki Allahdan başqa ibadətə layiq ilah yoxdur..."** [33]

**"....Ancaq bilərək haqqa şəhadət edənlər müstəsnadır..."** [34]

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***"Kim "Ləə iləhə İlləllah"ın mənasını bilərək ölərsə Cənnətə girər."*** [35]

---

30 Şeyx Süleyman bin Abdullah bin Muhəmməd bin Abdulvahhab . Nəcd alimlərindəndir. Tövhidlə bağlı bir çox risalələri vardır. Hicri 1233-cü ildə vəfat etmişdir.

31 Mutəahhirin- sonradan gələnlər deməkdir.

32 Təfsirul Azizul Hamid: 80.

33 Muhəmməd: 47/19.

34 Əz-Zuxruf: 43/86.

35 Muslim: İman: 10.

“Ləə iləhə İlləllah”ın mənası: “Allahdan başqa qulluq və ya ibadət ediləcək heç kimsə yoxdur” deməkdir.

**İbadət:** Allahın *c.c* sevdiyi və razı olduğu, bütün gizli, açıq əməllər və sözlərdir.

**2. Yəqinlik:** “Ləə iləhə İlləllah”ın kamalıdır. Yəqinlik şübhəni uzaqlaşdırır.

Allah *c.c* belə buyurur:

**“Möminlər ancaq Allaha və Rəsuluna iman edib, sonra imanlarında şübhəyə düşmədən Allah yolunda malları və canlarıyla cihad edən kimsələrdir. Məhz onlar sadiq olanlardır.”** [36]

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***““Ləə iləhə İlləllah, Muhəmmədur Rəsulullaha” şəhadət edən, Allahın c.c hüzuruna bu ikisində şəkk etmədən çıxan kimsə Cənnətə girər. ”*** [37]

**3. İxlas:** Şirki rədd etməkdir.

Allah *c.c* belə buyurur:

**“Xalis din ancaq Allahındır.”** [38]

**“Onlar dini yalnız Allaha xas qılaraq ibadət etməkdən başqa bir şeylə əmr olunmadılar.”** [39]

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***“Qiyamət günü insanlar arasında mənim şəfaətimə nail olacaq ən xoşbəxt adam, qəlbindən ixlaslı bir şəkildə “Ləə iləhə İlləllah” deyəndir.”*** [40]

**4. Sidq:** Nifaqa əngəldir. Münafiqlər dilləriylə haqqı söyləməkdə, ancaq qəlbən inkar etməkdədirlər.

Allah *c.c* belə buyurur: **“...Allah sadiqləri də düz danışanları da tanıyır .”** [41]

**“Haqqı gətirən və onu təsdiq edənlərə gəlincə, onlar əsl sadiqlərdir.”** [42]

---

[36] Əl-Hucurat: 49/15.
[37] Muslim: İman: 10.
[38] Əz-Zumər: 39/3.
[39] Əl-Beyyinə: 98/5.
[40] Buxari: Rikak: 51, Elm: 33, Əhməd: 1/173-174.
[41] Əl-Ənkəbut: 29/3.
[42] Əz-Zumər: 39/33.

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***"Kim Allahdan başqa ibadətə layiq ilah olmadığını və Muhəmmədin Allahın Rəsulu olduğunu qəlbiylə təsdiq edərək ölərsə Cənnətə girər."*** [43]

**5. Məhəbbət:** Bu kəlmə münafiqlərin etdiklərinin əksinə Allahı *c.c* və Allahın sevdiklərini sevməkdir. Allah *c.c* belə buyurur:

**"İnsanlardan elələri vardır ki, Allaha şərik qoşar, onları Allahı sevdikləri kimi sevərlər. İman gətirənlərin Allaha məhəbbəti isə daha qüvvətlidir."** [44]

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur: ***"Bu üç şey kimdə olarsa, imanın dadını almışdır. Allah və Rəsulunu hər kəsdən çox sevmək, sevdiyini ancaq Allah üçün sevmək, Allah onu küfrdən qurtardıqdan sonra təkrar küfrə dönməkdən Cəhənnəm oduna atılacaqmış kimi qorxmaq."*** [45]

**6. Bu kəlmənin tələblərinə əməl etmək:** Bunlar Allahın *c.c* rizasını qazanmaq məqsədilə, ixlasla edilən əməllərdir. Bu davranış, tam bir təslimiyyətin gərəyidir.

Allah *c.c* belə buyurur:

**"Rəbbinizə yönəlin və Ona təslim olun..."** [46]

**"Kim yaxşı əməl sahibi olub özünü Allaha təslim edərsə, o qopmayan bir qulpa yapışmışdır..."** [47]

**7. İnkarı yox edən qəbul:** Allahın *c.c* əmrlərinə bağlılıq göstərmək, əmr etdiklərini edərək qadağan etdiklərindən çəkinmək. [48]

---

[43] Əhməd.

[44] Əl-Bəqərə: 2/165.

[45] Buxari: İman: 8, Muslim: İman: 67, Tirmizi: İman: 10, Nəsai: İman: 3, İbn Macə: Fitən: 23.

[46] Əz-Zumər: 39/54.

[47] Loğman: 31/32.

[48] Fəthul-Məcid: 91-Burada sözü gedən "əməl etmə" şərti mütləq mənada hər əmələ aid deyil. Bu baxımdan əməllər iki qisimdir. Bu şərtdəki əməllər, edənin dindən çıxacağı, müsəlman olmayacağı ilə nəticələnən əməllərdir. Yəni hər günah edən müsəlman İslamdan çıxmaz. Bu Əhli- Sünnətin icma etdiyi bir məsələdir. Müəllifin burada qəsd etdiyi Tövhidə əməl etmək, onu poza biləcək heç bir əməl işləməməkdir. Bir insanın şirk işləməməsi üçün ən azı nəyin şirk olduğunu bilməsi lazımdır. Şirki bilməyən bir insan ondan necə çəkinə bilər? Təbii ki bu mümkün deyildir.

## LƏƏ İLƏHƏ İLLƏLLAHIN MƏNASI VƏ TƏLƏBLƏRİ

"Ləə iləhə İlləllah"ın mənası: tək ilahdan başqa ibadət, qulluq ediləcək başqa bir ilah yoxdur. O tək olan ilah da, şəriki olmayan uca Allahdır. Çünki ibadətə layiq olan ancaq Odur. Bu kəlmənin tələbi, Allahdan *c.c* başqa bütün saxta ilahları rədd etməkdir. Çünki Allahdan *c.c* başqa ibadət edilən məbudların ilahlıq iddiası batildir. Çünki Ondan başqa bir şey ibadətə (dua edilməyə, qanun qoymağa, nizam təsbit etməyə) layiq deyildir. Uluhiyyətin başqaları üçün rədd edilməsi, ilahlığı ancaq şəriki olmayan Allaha *c.c* aid etməyi və Onun yanında ikinci bir ilaha ibadət etməməyi tələb edir. Allah *c.c* belə buyurur:

**"Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın..."** [49]

**"Kim tağutu inkar edib Allaha iman edərsə, şübhəsiz qopmaq bilməyən bir qulpa yapışmış olar. Allah eşidəndir, biləndir."** [50]

**"Biz hər ümmətə, yalnız Allaha ibadət etmələri və tağutdan da çəkinmələri üçün rəsul göndərdik..."** [51]

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***"Kim "Ləə iləhə İlləllah" deyər və Allahdan başqa ibadət edilənləri rədd edərsə malı və qanı haram olar..."*** [52]

Bütün rəsulların qövmlərini dəvət etdikləri söz budur:

**"...Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa ilahınız yoxdur..."** [53]

**İbni Rəcəb** *rh* belə demişdir:

"İlah qorxulan, çəkinilən, ümid edilən, ucaldılan, sevilən, təvəkkül edilib istənilən, dua edilən və yalvarılan, itaət edilib üsyan edilməyəndir. Bütün bunlar ancaq Əziz və Cəlil olan uca Allaha yaraşar." [54]

Məhz bu səbəblə Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* Qureyş müşriklərinə: "Ləə iləhə İlləllah deyin" dedikdə müşriklərin cavabı:

**"İlahları tək bir ilahmı etdi? Həqiqətən bu çox təəccüblü bir şeydir."** [55] demək olmuşdur.

---

49 Ən-Nisa: 4/36.
50 Əl-Bəqərə: 2/256.
51 Ən-Nəhl: 16/36.
52 Muslim: İman: 8.
53 Əl-Əraf: 7/59.
54 Kurrəti Uyun əl-Muvahhidin: 25.

Kəlmeyi-Şəhadətin ümumi mənası Allahdan başqa ibadət edilənləri rədd edər və batil qılar. Yəni tağutu rədd və Allaha *c.c* iman etməyi tələb edər. **Tağutu [56] rədd etmək**- Allahın *c.c* əmr və qadağalarına zidd olan əmrlər verən insanlar və qurumları, havanı, həvəsi və şeytanı rədd etməkdir. "Ləə iləhə İlləllah"ın mənası ilə birlikdə tələblərini də yerinə yetirmək, ibadətdə Allahı *c.c* birləyərək Ona bənzər tutulanları tərk etməkdir.

Qul, "Ləə iləhə İlləllah" dedikdə: ibadətdə Allahı *c.c* birlədiyini, Allahdan *c.c* başqalarına, bütlərə, qəbirlərə, övliyalara və salehlərə ibadət etməyin batil olduğunu elan edər.

"Ləə iləhə İlləllah"ın tələbi, Allahdan başqa ibadətə layiq ilah olmadığını, yaradıcı, qüdrət sahibi, və hər şeyə qadir olanın Allah olduğunu qəbul etmək, Allahdan başqa heç kimin hakimiyyət haqqı olmadığına inanmaqdır. Çünki hakimiyyət yalnız Allaha *c.c* aiddir. Kim "Ləə iləhə İlləllah"ı bu şəkildə inanaraq açıqlayarsa mütləq olaraq Tövhidin haqqını vermiş olar.

Allaha *c.c* yaxınlaşmaq üçün ölülərə qurban kəsən, türbələrə sədəqə verən, qəbirləri tavaf edən və nəzir verənlər, Allahın *c.c* yaradıcı və hər şeyin sahibi olduğuna inansalar belə, ilk Ərəb müşrikləri kimi Allaha *c.c* şərik qoşarlar. Məkkə müşrikləri, qəbirlərə və bütlərə ibadət etmədiklərini söyləyir, ancaq həyatda bunun əksini edirdilər. Onlar yaradıcı və ruzi verici olduğuna inanmadıqları halda, sırf onları Allaha *c.c* daha çox yaxınlaşdırsın deyə saleh olduğuna inandıqları bəzi insanlara ibadət edirdilər.

Hakimiyyət, "Ləə iləhə İlləllah"ın əsl mənasının bütününü deyil, sadəcə bir hissəsini təşkil edir. Çünki ibadətdə şərik qoşan bir kimsənin, şəriətin hökmünü qəbul etməsinin bir faydası yoxdur. Əgər "Ləə iləhə İlləllah"ın mənası onların zənn etdikləri kimi olsaydı, Rəsulullahla *(səlləllahu əleyhi və səlləm)* müşriklər arasında hər hansı bir mücadilə olmazdı, onlar da Rəsulullahı qəbul edərlərdi.

Belə bir vəziyyətdə, Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* onlara:

"Allahın *c.c* varlığını və hər şeyə qadir olduğunu təsdiq edin, hüquqi məsələlərdə şəriətin hökmünə tabe olun" deyər və onları ibadətlərində sərbəst buraxardı. Belə olduqda Allah Rəsuluna *(səlləllahu əleyhi və səlləm)* tabe olarlardı.

Bunlar, Ərəb dilinin əhli olan bir qövm olduqları üçün "Ləə iləhə İlləllah"ın bütlərə ibadəti rədd etdiyini və sadəcə ləfzi bir məna daşımadığını başa düşürdülər. Buna görə də bu kəlməyə nifrət edərək uzaqlaşdılar və belə dedilər:

---

[55] Sad: 38/5.

[56] Tağut- bu kəlmə haqda alimlər bir çox açıqlama vermişlər. Allahdan başqa ibadət edilən, Allaha ibadətə mane olan, Allahın haramını halal edən Tağutdur. Ancaq burada bir istisna var. Hansısa saleh bir adam özü istəmədən ona ibadət edənlər ola bilər . Bu ibadətə razı qalmayan insan Tağut olmaz. Məsələn Xristianlar İsaya *as* ibadət edirlər amma O buna razı olmadığından Tağut olmur.

**“İlahları tək bir ilahmı etdi? Həqiqətən bu çox təəccüblü bir şeydir.”**

Allah *c.c* onları belə vəsf edir:

**“Onlara “Ləə iləhə İlləllah” deyin deyildiyi zaman təkəbbür göstərdilər və: “Dəli bir şairdən ötrü ilahlarımızı tərk edəkmi?” dedilər.”** [57]

Onlar “Ləə iləhə İlləllah”ın, Allahdan başqa ibadət edilən hər şeyi rədd etmək, ancaq Allaha *c.c* ibadət etmək mənasını verdiyini çox gözəl bilirlərdi.

Əgər müşriklər “Ləə iləhə İlləllah” dedikləri halda bütlərə ibadət etməyə davam etsələrdi, öz içlərində ziddiyyətə düşərək bundan narahat olarlardı.

Günümüzdə qəbirlərə ibadət edənlər, bu şiddətli ziddiyyətdən heç narahat olmurlar. Onlar “Ləə iləhə İlləllah” demələrinə baxmayaraq, ibadətlərinin bir çoxunu ölülərə etməyə davam edirlər.

Əbu Cəhil və Əbu Ləhəb, bu kəlmənin mənasını günümüzdə qəbirlərə ibadət edənlərdən daha yaxşı bilirdilər. Amma onların belə əli qurudu!

**Nəticə olaraq:** Kim bu kəlməni mənasını bilərək söyləyər, tələblərinə əməl edib, açıq və gizli şirkdən çəkinərsə, ibadəti tam bir etiqadla Allaha *c.c* xas qılıb, buna əməl edərsə o əsl bir mömindir. Kim “Ləə iləhə İlləllah” deyib, inanmadığı halda zahirən əməl edərsə o da münafiqdir. Kim bu kəlməni diliylə söyləyər, ancaq onu pozacaq əməllərdən birini işlərsə və ya Allaha *c.c* şərik qoşarsa o da müşrikdir!

“Ləə iləhə İlləllah” kəlməsindən qəsd edilən: mənasını bilib, bu mənanın tələb etdiyi şəkildə Allaha *c.c* ibadət etməkdir.

İbadət, müamilələrdə və bütün məsələlərdə Allahın *c.c* hökmünü qəbul edib, bəşəri qanunları rədd etmək, insan və cin şeytanlarının meydana çıxardığı bütün xurafələri, bidətləri ortadan qaldırmaq bu kəlmənin əməli tələblərindəndir.

Allah *c.c* belə buyurur:

**“Yoxsa onların Allahın dində izin vermədiyi bir şeyi onlar üçün halal edən şərikləri vardır?”** [58]

**“...Əgər onlara itaət etsəniz, şübhəsiz ki siz də müşrik olarsınız.”** [59]

**“Onlar Allahı qoyub alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə Rəbb etdilər.”** [60]

---

[57] Əs-Saffat: 37/35-36.

[58] Əş-Şura: 42/21.

[59] Əl-Ənam: 6/121.

Nəbi *(səlləllahu əleyhi və səlləm)* bu ayəni oxuduqda Adiyy bin Hatim *ra* Rəsulullaha *(səlləllahu əleyhi və səlləm)* dedi ki:

***"Onlar, onlara ibadət etmirdilər."***

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)*:

***"Onlar Allahın haram qıldığı şeyi halal, halal qıldığı şeyi haram etdikləri zaman onlara itaət etmirdilərmi? " dedi.***

Adiyy bin Hatim : ***"Bəli"*** deyincə,

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)*: ***"Bax beləcə onlara ibadət edirdilər" buyurdu."*** [61]

**Şeyx Abdurrahman bin Həsən** [62] *rh* demişdir: "Allahdan başqalarına itaət etməklə alimlərini Rəbb etdilər. Eyni şeylər bu ümmətin də içində baş verməkdədir. Bu isə ən böyük şirk olub, "Ləə iləhə İlləllah"ın mənasını ortadan qaldırır."

Bu kəlməni söyləyən bir kimsənin, bəşəri qanunlarla mühakimə olunmağı da rədd etməsi lazımdır. Çünki ancaq Allahın *c.c* kitabıyla mühakimə olunmaq, bəşəri sistemləri tərk etmək vacibdir.

Allah *c.c* belə buyurur:

**"...Əgər bir şeydə ixtilafa düşsəniz, onu Allaha və Rəsuluna həvalə edin."** [63]

**"Hər hansı bir şey haqqında ixtilafa düşsəniz, onun barəsində hökm vermək haqqı Allahındır. Mənim Rəbbim olan Allah Odur..."** [64]

Allah *c.c* öz endirdiyi şəriətlə hökm etməyənlər haqqında- kafir, fasiq, zalım deyə hökm vermişdir. Allahın *c.c* endirmədiyi ilə hökm verən insanda iman yoxdur.

"Ləə iləhə İlləllah" müsəlmanların həyatlarının hər yönünə hakim olmalı bir həyat nizamıdır.

Bəzilərinin zənn etdikləri kimi, sadəcə mənasını anlamadan, tələblərinə əməl etmədən, səhər və axşam məclislərində bərəkət üçün təkrar edilən bir sözdən ibarət deyildir.

---

60 Ət-Tövbə: 9/31.

61 Tirmizi: Təfsir: 10, Təbəri: 14/210 (61632-61634), Mənsur: 3/230, Beyhaki: Sünanul-Kubra, İbni Teymiyyə həsəndir dedi.

62 Şeyx Abdurrahman bin Həsən. Nəcd alimlərindəndir. Hicri 1285-ci ildə vəfat etmişdir.

63 Ən-Nisa: 4/59.

64 Əş-Şura: 26/10.

“Ləə iləhə İlləllah”ın tələblərinə bağlılıq, Allahın ad və sifətlərinə, Allah və Rəsulunun bildirdiyi şəkildə iman etməyi istəyir.

Allah *c.c* belə buyurur:

**“Ən gözəl adlar Allahındır. Onu bu adlarla çağırıb dua edin. Onun adları barəsində sapanları tərk edin. Onlar etdiklərinin cəzasını alacaqlar!”** [65]

**Abdurrahman bin Həsən** *rh* demişdir:

“Ərəb dilində ilhad kəlməsinin mənası, Allahın *c.c* ad və sifətləri haqda azmağa meyl etmək və yalana yönəlməkdir. Bilərək və bilməyərək, bəzi təvillərlə Allahın *c.c* ad və sifətlərinin haqq olan mənasını inkar etmək və Onu məxluqata bənzətməkdir.

Hər kim Allahın *c.c* ad və sifətlərini pozar, təvil edər və ya qəbul etməz, Cəlil olan mənalarına dəlalət edən mənasını ortadan qaldırarsa, Cehmiyyə, Mötəzilə və Əşarilər kimi “Ləə iləhə İlləllah”ın dəlalətinə müxalifət etmiş olar. Çünki ilah, ad və sifətləri ilə dua edilən və vəsilə olunandır. Allah *c.c* belə buyurur:

**“Ən gözəl adlar Allahındır. Onu bu adlarla çağırıb dua edin...”**

Ad və sifətləri olmayan necə ilah ola bilər? Ona nə ilə və necə dua edilər?” [66]

**İmam İbni Qayyim** *rh* demişdir:

“İnsanlar əhkam ayələrinin təfsirində ixtilafa düşdülər. Ancaq Allahın *c.c* sifətləriylə bağlı ayə və hədislərin hər hansı birində ixtilafa düşmədilər, əksinə səhabə və tabiin bu ayələrin mənasını anladılar və gərəyilə əməl etdilər.

Quranda olan əhkam ayələrinin mənasını elm əhlindən başqası anlaya bilməz, ancaq sifətlə bağlı ayələrin mənasını bütün insanlar anlaya bilər. Bundan qəsd etdiyim mənanın keyfiyyətinin deyil, əslinin anlaşılmasıdır.” [67]

“Bu mövzu sağlam fitrət və səmavi kitablarla bilinən bir mövzudur. Kamal sifətlərini itirən ilah, müdəbbir və Rəbb ola bilməz. Əksinə qüsuru səbəbiylə ələ salınar.

Həmd, əzəldə və əbəddə Cəlal və Kamal sifətlərinə sahib olana aiddir. Çünki həmdə layiq olan ancaq Odur.” [68]

“Allahın *c.c* kamal sifətlərinə sahib olduğuna və bütün nöqsan sifətlərindən və məxluqata bənzəməkdən uzaq olduğuna mütləq inanmaq lazımdır.” [69]

---

65 Əl-Əraf: 7/180.

66 Fəthul-Məcid: 237-238.

67 İbni Qayyim: Mədaricus-Salikiyn: 1/29-30.

68 Muhtasar Səvaikil-Mursəl: 1/10.

**LƏƏ İLƏHƏ İLLƏLLAH SÖZÜ NƏ ZAMAN FAYDA VERƏR ?**

"Ləə iləhə İlləllah"ın fayda verə bilməsi üçün söyləyən kimsənin bu kəlmənin mənasını bilib, bu mənanın tələblərinə əməl etməsi lazımdır. Bəzi insanlar, bir neçə nası dəlil gətirərək, "Ləə iləhə İlləllah"ın ancaq dillə tələffüz edilən bir sözdən ibarət olduğunu iddia edirlər.

**Şeyx Süleyman bin Abdullah** *rh* bu iddiaya belə cavab verir:

"İtbandan *ra*: Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurdu:

***"Allah onun rizasını qazanmaq üçün "Ləə iləhə İlləllah" deyən kimsəyə Cəhənnəmi haram qıldı."*** [70]

Muaz bin Cəbəl *ra* minik üzərində yolçuluqda Allah Rəsuluna *(səlləllahu əleyhi və səlləm)* yoldaşlıq etdiyi vaxt Nəbi *(səlləllahu əleyhi və səlləm)* ona:

***"Ey Muaz!"*** deyə səsləndi.

Muaz bin Cəbəl *ra* :

***"Buyur ya Rəsulullah! Hazıram"*** dedi:

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)*:

***"Şübhəsiz Allah, Allahdan başqa ibadətə layiq ilah olmadığına və Muhəmmədin Onun qulu və elçisi olduğuna şəhadət edən hər qula atəşi haram qılmışdır..."*** [71]

Ubədə bin Samitdən *ra*: Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurdu:

***"Hər kim "Ləə iləhə İlləllah və Muhəmmədur Rəsulullah" şəhadətini gətirərsə Allah ona atəşi haram edər."*** [72]

Əbu Hureyrə *ra* Rəsulullahdan *(səlləllahu əleyhi və səlləm)* belə buyurdu:

---

[69] İbni Qayyim: Mədaricus-Salikiyn: 1/26. Ad və sifət mövzusuna bir çox insan əhəmiyyət vermir amma əslində bu Tövhidin bir parçasıdır. Müsəlman olmaq istəyən hər bir şəxs Rəbbinin hansı ad və sifətlərə malik olması barədə məlumata malik olmalıdır. Yoxsa Tövhidi yarımçıq olar!

[70] Buxari: Rikak: 6, İstitabə : 9, Muslim: İman: 47, Tirmizi: İman: 17, Əhməd: 4/44.

[71] Buxari: Cihad: 46, Rikak: 36, Muslim: İman: 49.

[72] Buxari: Ənbiya: 47, Təfsir: 5/17, Muslim: İman: 46, Tirmizi: Qiyamə: 10, Əhməd: 2436,5/292.

***"Hər kim Allahdan başqa ibadətə layiq ilah olmadığına və mənim də Allahın Rəsulu olduğuma şəhadət edər, və bu ikisindən heç bir şübhə duymadan bu kəlmə ilə Allahın hüzuruna çıxarsa Cənnətə girər."*** [73]

Rəsulullahın *(səlləllahu əleyhi və səlləm)* ***"Ləə iləhə İlləllah deyən kimsə atəşə girməz"*** hədisi və bənzəri hədislər, bir çoxları tərəfindən yanlış açıqlanmış, bəziləri isə hədislər qarşısında çıxılmaz vəziyyətə düşmüş, hətta bunlara "nəsx olunub" deyənlər belə olmuşdur.

Çünki Tövhid kəlməsi- Allahdan başqa ibadət edilənləri və sayğı göstərilənləri rədd etməyi, Allah sevgisini, Allahın bütün əmrlərinə boyun əyməyi və təslimiyyəti, Allaha kamil mənada itaəti, səmimi və ixlaslı olaraq, şirkdən uzaq bir şəkildə ibadət etməyi, qadağan etdiyini qadağan etməyi, ver dediyini verməyi, Onun üçün buğz [74] etməyi tələb edir.

"Ləə iləhə İlləllah" kəlməsini dillə söyləyənin bütün əməllərini şirkdən təmizləməsi gərəkdir.

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurmuşdur:

***"Hər kim" "Allahdan başqa ibadətə layiq ilah yoxdur" deyər və Allahdan başqa ibadət edilən şeyləri rədd edərsə malı və canı haram olar. Hesabı da Allaha aiddir."*** [75]

**Muhəmməd bin Abdulvahhab ən-Nəcdi** [76] *rh* bu hədislə bağlı bunları deyir:

"Allah Rəsulu *(səlləllahu əleyhi və səlləm)* bu kəlmənin mənasını ən açıq bir şəkildə izah etmişdir. Diqqət edilərsə hədis, bu kəlməni ancaq dillə söyləyən kimsənin malının və canının haram olmayacağını, ancaq bu kəlmənin mənasını bilməklə, imanın tələbinin yerinə yetirilmiş olmayacağını bildirir.

Bəli, bu kəlməni ancaq dillə demək, Allahdan başqa ibadətə layiq ilah olmadığını, Onun bənzəri və şəriki olmadığını söyləmək insanın canının və malının qorunmasını təmin etmək üçün yetərli olmaz. İnsanın can və mal qorumasına sahib ola bilməsi üçün yuxarıda sıralanan şərtlərə əməl edib, bütün küfr növlərini və sistemlərini rədd etməsi, üzərinə düşənləri yerinə yetirməsi lazımdır. Bu kəlmənin tələblərini yerinə yetirməzsə, bunlardan az da olsa uzaqlaşarsa ya da şübhə edərsə can və mal qorumasından söhbət belə gedə bilməz." [77]

---

73 Muslim: İman: 10.

74 Buğz etmək -Nifrət etmək deməkdir.

75 Muslim: İman: 23, Əhməd: 3/472.

76 Muhəmməd bin Abdulvahhab. Hicri 1115-ci ildə Uyeynədə doğulub. On yaşında Quranı əzbər bilib. Yaşadığı əsrdə Tövhid elmini nəzəri və tətbiqi dirçəldənlərdən olub.

77 Kitab ət-Tövhid: 115.

Bunu qəti bir şəkildə bilməyimiz lazımdır ki: Məqsəd, sadəcə bu kəlmənin ləfzlərini saymaq və ya əzbərləmək deyildir.

Necəki **Vehb bin Münəbbih** [78] *rh* ona "Ləə iləhə İllәllah" Cənnətin açarı deyilmi?" deyə soruşan birinə bu cavabı vermişdir:

"Əlbəttə elədir, ancaq açacaq olan açarın dişləri varsa! ancaq dişləri olan bir açar gətirsən sənin üçün Cənnətin qapısı açılar, əks təqdirdə açılmaz." [79]

Bu açarın dişləri "Ləə ilәhә İllәllah" kəlməsinin mənasını bilib, şərtlərini yerinə yetirərək əməl etməkdir. Bunlardan bəziləri:

**1**- "Ləə ilәhә İllәllah" kəlməsinin rədd və isbat anlamında daşıdığı bütün mənaları lazımınca bilmək.

**2**- Şübhə yeri olmayan, əsl anlamda iman. Bu kəlməni söyləyən kimsə, şəkk və şübhəsi olmadan kəlmənin nəyə dəlalət etdiyini və mahiyyətinin nə olduğunu bilməlidir. Çünki iman deyilincə, onda zənnə yer yoxdur, onda qəti elm şərtdir.

**3**- Bu kəlmənin tələb etdiyi bütün şərtləri, diliylə və qəlbiylə qəbul edib, təslim olmaq.

**4**- Bu kəlmənin tələb etdiyi şeylərə boyun əymək və buna zidd olan hər şeyi tərk etmək.

**5**- Doğruluq. Əməllərin qəlbin söylədiyi və dilin ifadə etdiyinə uyması.

**6**- İxlas. Şirk ləkələrindən və pisliklərindən təmizlənərək xalis bir niyyətlə əməl etmək.

**7**- "Ləə ilәhә İllәllah" kəlməsini söyləyib, tələblərinə əməl edənləri sevmək, əməl etməyib ziddiyyət içində olanlara da nifrət etmək.

**8**- Möminləri dost tutmaq, kafirlərdən uzaq durmaq və tağutu rədd etmək.

**İbni Teymiyyə** [80] *rh* və bəzilərinin bu sözü, mövzu haqq-ında söylənəcək sözlərin ən gözəlidir: "Bütün bu hədislər şəhadət kəlməsini söyləyən, bu hal üzrə ölən kimsələr haqqındadır."

---

[78] Tabiin dövründə yaşamış məşhur Hədis alimi. Hicri 24-ci ildə Sanada anadan olmuş, hicri 124-cü ildə də orada vəfat etmişdir.

[79] Buxari: Cənaiz: 1, "Fəthul-Bari"də də bir hədisin açıqlaması verilərkən zikr edilmişdir.

[80] Takyuddin Əbul Abbas bin Abdulhalim bin Teymiyyə *rh* . Hicri 661-ci ildə Harranda anadan olmuşdur. Böyük alimlərdən İbni Qayyim *rh*, İmam Zəhəbi *rh*, İbni Kəsir *rh*

Bu hədislər, digər rəvayətlərdə "doğrulamaq, mənasını bilmək, heç bir şəkildə şübhə etməmək, qəlbindən xalisanə bir yəqinliklə söyləmək" kimi qeydlərlə də görülməkdədir.

Şübhəsiz Tövhidin həqiqəti, ruhu bütünlüklə Allaha yönəldərək, Allahdan başqa ibadətə layiq ilah olmadığına şəhadət etməkdir. Belə bir kimsə sözündə doğru olduğunda Cənnətə girəcəkdir. Çünki ixlas, həqiqətən bütün günahlardan tövbə edərək qəlbi Allaha *c.c* yönəltməkdir. Qul bu hal üzrə öldüyü təqdirdə Cənnətə nail olacaqdır.

Mütəvatir hədislərdə qəlbində bir arpa və ya xardal dənəsi ya da toz zərrəsi qədər də olsa imandan əsər olan kimsənin, odda əbədi olaraq qalmayacağı, "Ləə iləhə İlləllah" üzrə ölənin cəzasını çəkdikdən sonra Cəhənnəmdən çıxacağı və atəşin, Allah üçün namaz qılanların, səcdə izlərini yandırmayacağı bildirilmişdir.

Bütün bu açıqlamalardan, Allahdan başqa ibadətə layiq ilah olmadığına və Muhəmmədin Allahın qulu və elçisi olduğuna şəhadət edən kimsə üçün Cəhənnəmin haram qılındığı anlaşılmaqdadır. Ancaq önəmli qeydlərdə bunun şərtləri də müəyyən olunmuşdur. Dolayısıyla ixlasdan, yəqinlikdən uzaq olan və mənasını dərk etmədən, bilmədən kəlimeyi-şəhadəti söyləyən kimsənin, ölüm əsnasında bununla imtahan olunacağından qorxulur. Bu vəziyyətdə şəhadətdən ayrılaraq, şəhadət üzrə ölməyə bilər.

Bir çox kimsə "Ləə iləhə İlləllah" kəlməsini sadəcə bir adət-ənənə olaraq söyləməkdə, iman qəlblərinin dərinliklərinə girməməkdədir. Əksər hallarda bu kimsələr, hədislərdə açıqlandığı kimi ölüm anında fitnəyə uğrayırlar. O zaman soruşulduqda hədisdə bildirildiyi kimi:

***"İnsanlar bir şey söyləyərkən eşitdim məndə söylədim"*** [81] şəklində cavab verərlər. Çox halda bu kimi insanların əməlləri, özləri kimi olanları quru bir təqliddən oyana keçmir. Onların halı bu ayədə bildirilənə olduqca yaxındır.

Allah *c.c* belə buyurur:

**"...Biz atalarımızı bu din üzrə gördük və biz də onlara uymaqdayıq" dedilər."** [82]

O halda insanın bu kəlməni - ixlasla və tam bir yəqinliklə, ayrıca günah işləmədən, günahda israrlı olmadan, əsl bir qavrayışla söyləməsi mövzusuyla, hədislər arasında bir ziddiyyət yoxdur. Burada ixlas və yəqinliyin tam olması üçün Allahı *c.c* hər şeydən çox sevmə məcburiyyəti də vardır. Bu vəziyyətdə insan Allahın qadağan etdiyi şeylərə qarşı qəlbində hər hansı bir meyl və ya sevgi hiss etməyəcəkdir.

---

onun tələbələrindəndir. Yaşadığı əsrdə sələfin irsini dirçəltmiş və buna görə dəfələrlə həbsə atılmışdır və hicri 728-ci ildə həbsxanada vəfat etmişdir.

[81] Buxari: Cənaiz: 68,87, Muslim: Cənnət: 70, Əbu Davud: Cənaiz: 78, Nəsai: Cənaiz: 110, Tirmizi: Cənaiz: 70.

[82] Əz-Zuxruf: 43/23.

Şübhəsiz bu iman, tövbə, ixlas, sevgi və yəqinlik gecənin gündüzü sildiyi kimi ondakı günahları siləcəkdir.

**Şeyx Muhəmməd bin Abdulvahhab** *rh* bu hədislər üçün belə bir açıqlama vermişdir:

"Bunların, bir başqa şübhəsi də budur:

"Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* "Ləə iləhə İlləllah" deyən bir adamı öldürdüyü üçün, Usaməni *ra* danlayaraq:

***"Sən, o adamı "Ləə iləhə İlləllah" dedikdən sonramı öldürdün?"*** [83] demiş ayrıca:

***"İnsanlarla "Ləə iləhə İlləllah" deyincəyə qədər savaşmaqla əmr olundum"*** [84] buyurmuşdur.

"Ləə iləhə İlləllah" deyənlərə toxunulmayacağına dair başqa hədislər də vardır. Cahillərin bu hədisləri dəlil olaraq gətirməkdəki məqsədləri: "Ləə iləhə İlləllah"ı əməllərində göstərməsələr belə sırf dillə söyləyənlərin təkfir edilməyəcəkləri, öldürülməyəcəkləri, hətta nə edərlərsə etsinlər, onlara qarşı bir şey edilməyəcəyi şəklindəki görüşlərini isbatlamaqdır.

Bu cahil müşriklərə deyilər ki: Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* "Ləə iləhə İlləllah" deyən yəhudilərlə döyüşdü və onları əsir aldı. Rəsulullahın *(səlləllahu əleyhi və səlləm)* səhabələri də Allahdan başqa ibadətə layiq ilah olmadığına və Muhəmmədin də Allahın Rəsulu olduğuna şəhadət etmələrinə, namaz qılıb, müsəlman olduqlarını irəli sürmələrinə baxmayaraq Bəni Hənifə ilə savaşdı. Əli bin Əbu Talib *ra* tərəfindən yandırılanların da vəziyyəti belə idi. Bu cahillər də, öldükdən sonra dirilməyi inkar edənlərin kafir olduqlarını deyir, və öldürülmələrinin lazım olduğunu bildirirdilər. Bu kimsələr "Ləə iləhə İlləllah" dedikləri halda bu bir şeyi dəyişdirmədi. Eynilə İslamın rüknlərindən hər hansı birini inkar edən bir kimsənin Tövhid kəlməsini söyləməsinin, təkfir olunması və öldürülməsi yönündə bir şeyi dəyişdirmədiyi kimi. Rüknlərdən birini inkar etdiyində insan təkfir edilirsə, fəri məsələlərlə bağlı hər hansı bir şeyi inkar halında niyə təkfir edilməsin?

Usamə *ra* "Ləə iləhə İlləllah" deyən bir insanı, can və mal qorxusu ilə müsəlman olduğunu zənn edərək öldürmüşdür. Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* yanlış bir hərəkət etdiyini bildirərək onu danlamışdır. Əgər bir insan, müsəlman olduğunu açıqlayarsa ondan bunun əksinə bir hal sabit olmadıqca malına və canına toxunmaq olmaz. Uca Allah bununla bağlı belə buyurmuşdur:

---

[83] Buxari: Diyət: 2, Muslim: İman: 96,158,159.

[84] Buxari: İman: 17, Muslim: İman: 22,41, Tirmizi: İman: 1-2.

**“Ey iman gətirənlər! Allah yolunda döyüşə çıxdığınız zaman diqqətli olun. Sizə hər salam verənə, dünya həyatının keçici mənfəətinə göz dikərək “sən mömin deyilsən” deməyin.”** [85]

Bu ayəyə görə ”Tövhid” kəlməsini söyləyən, ancaq halını bilmədiyimiz bir insanla qarşılaşdıqda, yaxşı-yaxşı araşdırıb halını bilənə qədər, onun malına və canına toxunmamamız lazımdır. Əgər İslama zidd olan bir halı ortaya çıxarsa öldürülər. Çünki: “Diqqətli olun, təsbit edib ortaya çıxarın” ifadəsi buna işarə etməkdədir. Bu kəlməni söyləyən insan, buna uyğun əməl etmədiyi görüldüyü təqdirdə, əgər öldürülməyəcəksə araşdırmağın bir mənası qalmaz. Necəki bu mövzuda, mənası bizim açıqladığımıza uyğun olan bir çox hədis vardır. Yəni bir insan Tövhid kəlməsini söyləyib, müsəlman olduğunu deyərsə ona toxunmamaq lazımdır. Ancaq söylədikləriylə ziddiyyət təşkil edən bir hal təsbit edildiyi təqdirdə, nə lazımdırsa o da edilməlidir.

Bunun dəlili isə bu hədisdir:

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* Usaməyə *ra* belə buyurmuşdur:

***“Sən, o adamı “Ləə iləhə İlləllah” dedikdən sonramı öldürdün?...”***

Yenə belə buyurmuşdur:

***“İnsanlarla “Ləə iləhə İlləllah” deyincəyə qədər savaşmaqla əmr olundum.”***

Xaricilərlə də bağlı olaraq da belə buyurmuşdur:

***“Onları harada görsəniz öldürün. Əgər mən onlara yetişə bilsəydim, onları eynilə Ad qövmünün öldürülməsi kimi öldürərdim.”*** [86]

Xaricilər, çox ibadət edən və çox təhlil gətirən kimsələrdir. Hətta səhabələr, onları gördükdə öz ibadətlərini onların ibadəti yanında az görərdilər. Bunlar elmi səhabələrdən öyrənirdilər. Bütün bunlara baxmayaraq, “Ləə iləhə İlləllah” demələri, çoxlu ibadət etmələri və müsəlman olduqlarını söyləmələri onlara bir fayda vermədi. Daha öncə söz etdiyimiz, yəhudilərlə və Bəni Hənifə ilə savaş halı da belə idi.

**Hafiz İbni Rəcəb** *rh* “Kəlmətul-İxlas” adı verdiyi risaləsində mövzunu belə açıqlamışdır: [87]

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurmuşdur:

---

85 Ən-Nisa: 4/94.

86 Bu hədis iki hədisin birləşməsidir. Bunlardan birincisi: **“Onları harada görsəniz öldürün.”** Buxari: Salat: 28, İstitabə:3, Muslim: Zəkat: 1066. İkincisi isə **“Ad qövmünün öldürülməsi kimi onları öldürərdim.”** Buxari: İtisam: 2,28 Muslim: Zəkat: 1064.

87 Hafiz İbni Rəcəb: Kəlmətul-İxlas: 13-14.

***"İnsanlarla "Ləə iləhə İlləllah" deyincəyə qədər savaşmaqla əmr olundum."*** [88]

Ömər *ra* və səhabələrdən bir qrup, bu hədisdən-bu iki şəhadəti gətirən hər kəsin yalnızca dünya cəzasından qurtulacağını anlamışlardı. Ancaq "Ləə iləhə İlləllah"a şəhadət etməsinə baxmayaraq zəkat verməyən kimsələrlə döyüşmək xüsusunda tərəddüdə düşmüşlərdi. Əbu Bəkr Siddiq *ra* bu hədisdən- ancaq "Ləə iləhə İlləllah"ı söyləyib, bunun mənası və tələblərinə uyğun hərəkət edən insanlarla savaşılmayacağını anlamış və bu görüşünə Rəsululla-hın *(səlləllahu əleyhi və səlləm)* hədisini dəlil gətirmişdir.

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***"Ləə iləhə İlləllah"ı diliylə deyib, bu sözün haqqını verdikləri zaman, onlar məndən mallarını və canlarını qorumuş olarlar. İnsanların hesabları isə Allaha aiddir."*** [89]

Əbu Bəkr Siddiq *ra*:

"Zəkat malın haqqıdır" demişdir.

Əbu Bəkrin *ra* anladığı bu məna İbni Ömər *ra*, Ənəs *ra* və digər bir çox səhabə tərəfindən Rəsulullahdan aşağıdakı kimi rəvayət edilmişdir:

***"Ləə iləhə İlləllah, Muhəmmədur Rəsulullah deyib, namazı qılıb, zəkatı verincəyə qədər insanlarla savaşmaqla əmr olundum."*** [90]

Bu hədisin daşıdığı mənaya, bu ayələr də dəlildir.

Allah *c.c* belə buyurur:

**"...Əgər tövbə etsələr, namaz qılıb, zəkat versələr onları sərbəst buraxın..."** [91]

**"Əgər tövbə etsələr, namaz qılıb, zəkat versələr dində sizin qardaşlarınız olarlar..."** [92]

Bu dindəki qardaşlıq, ancaq Tövhidlə bərabər digər fərzlərin də yerinə yetirilməsiylədir. Şirkdən tövbə isə, ancaq Tövhidlə mümkündür.

Əbu Bəkr *ra* bu hədisdən çıxardığı mənanı səhabələrə açıqlayınca, onu təsdiq edərək bu görüşünü qəbul etdilər. Sadəcə "Ləə iləhə İlləllah, Muhəmmədur Rəsulullah" deyən kimsədən dünya cəzasının qaldırılmayacağını, əksinə İslamın şərtlərindən birini

---

88 Muslim: İman: 17.

89 Buxari: İman: 8.

90 Buxari: İman: 16, Muslim: İman: 8.

91 Ət-Tövbə: 9/5.

92 Ət-Tövbə: 9/11.

pozduğuna görə şübhəsiz cəzalandırılacağını, ayrıca buna görə axirətdə də cəzalanacağını bildirmişlər.

Alimlərdən bir qrup belə demişdir:

Bu hədislərdə keçən, "Ləə iləhə İlləllah"ı söyləyib ona şəhadət etmək, Cəhənnəmdən qurtularaq Cənnətə girməyə səbəb olur. Bu səbəb isə, söylənən sözün şərtlərinin hamısı bir arada olması və onu ortadan qaldıracaq bir halın olmaması halında keçərli olar. Tövhid kəlməsinin şərtlərindən biri əskik olduqda və ya onu poza biləcək bir söz və əməl olduğunda bu kəlmə, söyləyənin Cəhənnəmdən qurtulmasını və Cənnətə girməsini təmin edə bilməz. Bu, Həsən *rh* və Vehb bin Münəbbihin *rh* açıq görüşüdür.

Firuzdakın xanımı öldükdə, dəfn edilərkən **Həsən** [93] *rh* Firuzdakdan soruşdu:

"Bu gün üçün sən nə hazırladın?"

Firuzdak:

"Yetmiş ildir söylədiyim "Ləə iləhə İlləllah" deyə cavab verdi.

Həsən:

"Bu nə gözəl hazırlıqdır! Ancaq "Ləə iləhə İlləllah" üçün bilinməsi və uyulması gərəkli olan şərtlər vardır. Ayrıca iffətli qadınlara iftira atmaqdan çəkin" dedi.

Həsənə *rh* deyildi ki: "İnsanlar "Ləə iləhə İlləllah" deyən kimsənin Cənnətə girəcəyini söyləyirlər. Nə deyirsən?"

Həsən *rh*: "Kim deyərsə və onun haqqını verərsə, yəni gərəyilə əməl edər, onu pozan şeylərdən qaçıb, şərtlərini haqqıyla yerinə yetirərsə Cənnətə girər."

**Vehb bin Münəbbih** *rh* ona "Ləə iləhə İlləllah Cənnətin açarı deyilmi?" deyə soruşan birinə bu cavabı vermişdir:

"Əlbəttə elədir, ancaq açacaq olan açarın dişləri varsa! Ancaq dişləri olan bir açar gətirsən sənin üçün Cənnətin qapısı açılar, əks təqdirdə açılmaz." Elm əhlindən nəql etmiş olduğum bu sözlər, məncə bu zənn və şübhələrə rəddiyə olaraq yetərlidir.

"Ləə iləhə İlləllah" deyən saleh bir kimsə, sehr etmək və sehr əhlini doğrulamaq, Allahdan başqasının qeybi bildiyini iddia etmək, kafir və müşrikləri dost tutmaq, din əhlini ələ salmaq, din adamlarını Rəbb etmək, Allahdan başqasına qurban kəsmək, hakimiyyəti Allahdan başqasına vermək, Allahdan başqasına dua etmək, və Allahla özü

---

[93] Həsənul Bəsri adı ilə məşhur olan bu alim tabiindəndir. Hicri 21-ci ildə Mədinədə anadan olub. Bir çox səhabədən dərs almışdır. Hicri 110-cu ildə vəfat etmişdir.

arasında vasitə tutmaq və s. şeyləri edərsə "Ləə iləhə İllələllah" sözü ona heç bir şəkildə fayda verməz. Cahillər özlərinə dəlil olaraq qapalı nasları alır, bunun yanında tamamən açıqlanmış nasları tərk edirlər. Bunların halı kitabın bir qisminə inanıb bir qismini inkar edənlərin halına bənzər.

Allah *c.c* bu cür insanlar haqqında belə buyurur:

**"Kitabı sənə endirən Odur. O kitabın bir qismi möhkəm ayələrdir -bunlar Kitabın əslidir. Digərləri isə mütəşabih ayələrdir. Qəlblərində əyrilik olanlar, fitnə çıxarmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih olan ayələrə tabe olarlar. Halbuki onların mənasını Allahdan başqa heç kim bilməz. Elmdə qüvvətli olanlar isə:**

**"Biz ona inandıq, hamısı Rəbbimizin qatındandır" deyərlər. Bunları ancaq ağıl sahibləri başa düşər."**

**"Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra qəlblərimizi sapdırma və bizə öz qatından bir mərhəmət bəxş et, şübhəsiz yalnız Sən bəxş edənsən."**

**"Rəbbimiz! Olacağında şübhə olmayan bir gündə, insanları toplayacaq olan şübhəsiz Sənsən. Allah əsla öz vədindən dönməz!"** [94]

Ey Allahım! Bizi haqqı haqq bilib, ona tabe olan və batili batil bilib ondan çəkinənlərdən et.

## LƏƏ İLƏHƏ İLLƏLLAHIN FƏRDƏ VƏ TOPLUMA TƏSİRİ

"Ləə iləhə İllələllah" kəlməsinin ixlaslı, doğru bir şəkildə, açıq və gizli olaraq söylənib, tələblərinə əməl edilməsi halında fərd və toplum üzərində böyük təsirə səbəb olduğu görülər:

**1.** "Ləə iləhə İllələllah" kəlməsi müsəlmanları bir din və bir əqidə sahibi qılıb, düşmənlərinə qarşı birləşdirər və bir qüvvə meydana gətirib, zəfərə çatmalarını təmin edər. Allah *c.c* belə buyurur:

**"Hamılıqla Allahın ipinə möhkəm sarılın və bölünüb parçalanmayın..."** [95]

**"Əgər səni aldatmaq istəsələr, əlbəttə Allah sənə yetər, yardımıyla bütün möminlərlə səni dəstəkləyən və qəlblərini birləşdirən Odur. Əgər sən yer üzündə nə varsa hamısını xərcləsəydin, yenə də onların qəlblərini birləşdirə bilməzdin. Fəqət Allah onları birləşdirmişdir. O Əzizdir, Hakimdir."** [96]

---

[94] Ali-İmran: 3/7-9.

[95] Ali-İmran: 3/103.

[96] Əl-Ənfal: 8/62-63.

Əqidədəki ixtilaf, parçalanmaya, çəkişməyə və düşmənçiliyə səbəb olur. Allah *c.c* belə buyurur:

**"Dinlərini paça-parça edib, firqələrə ayrılanlarla sənin heç bir əlaqən yoxdur…"** [97]

**"Amma insanlar öz dinlərini aralarında parça parça etdilər. Hər firqə öz dininə sevinir…"** [98]

"Ləə iləhə İllƏllah" dan başqa insanları Tövhid əqidəsi ətrafında toplayacaq heç bir şey yoxdur.

**2**. "Ləə iləhə İllələllah" kəlməsinin mənasına bağlı olan bir toplumda, əmin-amanlıq çoxalar. Çünki bu toplumdakı hər bir fərd, bu əqidəni yükləndiyinə görə Allahın *c.c* halal qıldığını alar, haram qıldığını tərk edər. Bu əqidəni yaşamalı olduğuna inandığından müsəlmanlara qarşı düşmənçiliyi, zülmü, həddi aşmanı tərk edər, bunun yerinə Allahın:

**"Möminlər ancaq qardaşdır..."** [99]

Ayəsinə əməl edərək, onlara Allah *c.c* üçün dostluq və sevgi göstərər, onlarla yardımlaşar.

Ərəblərin "Ləə iləhə İllələllah"ın tələblərinə bağlı olduqları zamandakı halları və bu bağı tərk etdikləri zamandakı halları ortadadır. Bu əqidədən öncə: düşmənçilik, oğurluq, intihar, təkəbbürlənmək, zorla qəsb etmək, zina və s. kimi şeylərlə iç-içə idilər.

Nə zaman ki "Ləə iləhə İllələllah"ın mənasına bağlı olaraq yaşamağa başladılar, o zaman bir-birlərini sevən qardaşlar oldular. Allah *c.c* belə buyurur:

**"Muhəmməd Allahın Rəsuludur. Onunla bərabər olanlar kafirlərə qarşı sərt, öz aralarında isə mərhəmətlidirlər..."** [100]

**"...Siz bir birinizə düşmən ikən, O sizin qəlblərinizi birləşdirdi və Onun nemətilə qardaş oldunuz..."** [101]

**3.** Müsəlmanlar "Ləə iləhə İllələllah"ın tələblərinə bağlı qaldıqları zaman, Allah *c.c* onları yer üzündə Onun hökmlərini tətbiq edənlərdən qılar. Tövhid dinini də çeşidli fikirlərin önündə sabit qılar.

---

97 Əl-Ənam: 6/159.
98 Əl-Muminun: 23/53.
99 Əl-Hucurat: 49/10.
100 Əl-Fəth: 48/29.
101 Ali-İmran: 3/103.

Allah *c.c* belə buyurur:

**“Allah içinizdən iman edib saleh əməl işləyənlərə, onlardan öncəkiləri hökmran qıldığı kimi onları da yer üzündə hökmran qılacağını, onlar üçün Allahın bəyəndiyi dinini möhkəmləndirəcəyini və onların qorxusunu əmin amanlıqla əvəz edəcəyini vəd etmişdir. Çünki onlar yalnız mənə ibadət edər və Mənə heç bir şeyi şərik qoşmazlar...”** [102]

İbadətdə tayı və bərabəri olmayan Allah *c.c* bu böyük istəyin meydana gəlməsini, “Ləə iləhə İlləllah”ın mənasına bağlamışdır.

**4.** Kim “Ləə iləhə İlləllah”ın tələblərinə əməl edərsə ağlı başında, nəfsi də rahat olar. Çünki o, tək olan Rəbbin razı olduğu şeyləri edər, həlak edici şeylərdən uzaqlaşaraq Allaha *c.c* qulluq edər.

Bunun əksinə, hər kim cürbəcür ilahlara qulluq edərsə, bu ilahlardan hər birinin ayrı ayrı istəkləri və başqa başqa tədbirləri olduğundan dünyada narahat və bədbəxt olacağı kimi, axirətdə də ziyana uğrayanlardan olar.

Allah *c.c* belə buyurur:

**“Ey mənim zindan yoldaşlarım ayrı-ayrı Rəblərmi daha xeyirlidir yoxsa hər şeyə Hakim və Qalib olan Allahmı?”** [103]

**“Allah bir məsəl çəkir: “ Bir adamın bir-biri ilə çəkişən bir neçə şərikli ağası var. Başqa bir adamın da yalnız bir ağası var. Heç bu iki adam vəziyyətcə eyni olarmı?” Həmd ancaq Allaha məxsusdur, lakin onların çoxu bilməzlər!”** [104]

**İbni Qayyim** *rh* belə demişdir: “Allah *c.c* bu ayədə muvahhidlə müşriki ayırmaq üçün misal vermişdir. Müşrik əxlaqı pozulmuş, bir-birinə düşmən olan camaatın sahib olduğu bir qul vəziyyətində olub, cürbəcür ilahlara ibadət edər. Bu ilahların da istəkləri də bir-birindən fərqli olduğu üçün heç birisini razı sala bilməz.

Muvahhid isə, ancaq tək olan Allaha qulluq edir ki onun vəziyyəti- Allaha bütün şirklərdən təmizlənərək təslim olan, hədəfini və rizasına aparacaq yolu bilən və bütün ixtilaflardan uzaq olaraq, əmin-amanlıq içində olan insanın vəziyyəti kimidir.

Bu qul, Rəbbinə şərik qoşmadan və ixtilaflardan təmizlənmiş olaraq təslim olar. Onun üzərində Rəbbinin rəhməti, şəfqəti və ehsanı vardır. Bu iki qul heç bir olarmı?” [105]

---

102 Ən-Nur: 24/55.

103 Yusif: 12/39.

104 Əz-Zumər: 39/29.

105 İbni Qayyim: İlamul-Muvakkin: 1/87.

**5**. "Ləə iləhə İlləllah"ın tələblərinə əməl edən qul, dünya və axirətdə yüksələr və şərəf qazanar.

Allahın *c.c* :

**"Bütün bunları Allahı birləyərək və Ona şərik qoşmadan edin. Kim Allaha şərik qoşarsa, sanki o göydən düşmüşdür, quşlar onu aparmışlar, yaxud küləyin sovurub uzağa atdığı bir şeydir."** [106] ayəsində də işarə etdiyi kimi, Tövhid yüksəkliyə, şirk isə, alçaqlığa dəlalət edər.

Əllamə **İbni Qayyim** demişdir: "İman və Tövhid yüksəlinən və enilən səma kimidir. İman və Tövhid üzrə olunduğunda yer üzündən səmaya yüksənilir. İmanı və Tövhidi tərk etmə halında isə, səmadan aşağılara enilir. Şiddətli çətinlik, üst-üstə gələn ağrı və acılar, müsibətlər bu halların nəticəsidir. Allah *c.c* göndərdiyi şeytanlarla, İman və Tövhiddən uzaqlaşanın əzalarını param parça edərək onu çətinliyə salar, davam edən bu əziyyət onu narahat edər və həlak çuxuruna düşürər.

**6.** "Ləə iləhə İlləllah" kəlməsini söyləyənin qanı və malı qorunmuş olar.

Rəsulullah *(səlləllahu əleyhi və səlləm)* belə buyurur:

***"İnsanlarla "Ləə iləhə İlləllah" deyincəyə qədər savaşmaqla əmr olundum. Onlar bunu edincə qanları və malları məndən qorunmuş olar. Ancaq İslam haqqı müstəsna..."*** [107] buyurmuşdur.

İslamın haqqı- "Ləə iləhə İlləllah"ın şərtlərini yerinə yetirib, şirkdən uzaqlaşaraq Tövhidi tam bir şəkildə əda etməkdir.

Sadəcə "Ləə iləhə İlləllah" sözünü söyləmək malı və qanı haram qılmaz.

Müvəffəqiyyət Allahdandır. Nəbiyə və səhabələrinə salam olsun.

---

[106] Əl-Həcc: 22/31.

[107] Buxari: İman: 17, Muslim: İman: 36, Tirmizi: İman:1.

